# Müqəddimə

Həqiqətən həmd (şükür və tərif) yalnız Allaha məxsusdur! Biz Ona şükür və tərif edir, Onu köməyə çağ ırır, Ondan bağışlanma və bizi haqq yoluna yönəltməyi diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Aləmlərə rəhmət olaraq göndərilən peyğəmbərimiz Muhəmmədə *(sallallahu aleyhi və səlləm)*, ailəsinə və səhabələrin hamısına Allahın salamı və xeyir duası olsun. Oxuculara təqdim olunan bu risalədə şiəliyin Səfəvilər zamanı yenidən şəkillənməsindən günümüzə qədər davam edən tarixi dövrə aydınlıq gətirilməyə çalışılır. 1979-cu ildə İranda baş verən inqilabdan sonra dövlətin idarə edilmə metodu inqilabın rəhbəri olan Xomeyni tərəfindən hazırlanmış "Vilayəti fəqih" nəzəriyyəsi əsasında həyata keçirilməyə başladı. İran konstitutsiyasında geniş təsbit olunmuş bu konsepsiyanı doğru anlamaq üçün tarixə qısa bir baxış keçirmək çox faydalı olardı. Risalənin hazırlanmasında əsasən Menderes Kurtun "Safavi dönemi şii ülema ve velayeti fakihin ortaya çıkışını hazırlayan tarihsel süreç" və Musa Uysalın "Velayeti fakih teorisi üzerine" kitablarından istifadə olunmuş və onlardan sitatlar gətirilmişdir.

Fuad Burhan

## Səfəvi şiəliyi – üsuli və əxbari anlayış

**"Əsası Ərdəbildə şeyx Səfiyyəddin (öl.mil 1334) tərəfindən qoyulmuş sünni məzhəbli bir sufi təriqəti olan Səfəvi ocağı onun soyundan gələn və təriqətin başına keçmiş şeyx Cüneyd (öl.mil 1460) və oğlu Heydərin (öl.mil 1488) zamanında sünni kimlikdən şiə-ələviliyə keçməyə başladı."**[1]

**"Ağqoyunlu dövlətinin zəifləməsi və daxili çəkişmələrdən istifadə edən bu təriqət Gilanda şiə mühitində yetişmiş, eyni zamanda Ağqoyunlu sülaləsi ilə qohum olan yeniyetmə İsmayılı 1501-ci ildə Təbrizdə şah elan etdi. Yeniyetmə, cəsur və fanatik bir ələvi-şiə təəssübkeşi olan şah İsmayılın ilk işlərindən biri yeni dövlətin rəsmi məzhəbini şiəlik elan etmək oldu. O, özünün Hz Əlinin soyundan gəldiyini və gözlənilən Mehdinin nümayəndəsi olduğunu iddia edirdi."**[2]

Bu tarixi hadisə yaxın Şərq və geniş coğrafiyada yaşayan xalqların gələcək taleyinə çox ciddi təsir etmişdi. Yüz illərlə ənənəvi dinlərinə bağlı yaşayan müsəlmanlar dini inanclarına görə təqib edilməyə başlandı, təşkil olunan aşura, təbərra (lənət etmə) məclislərində iştirak etməyə məcbur edilməklə və sistematik propaqanda nəticəsində tədricən şiələşdirildi. Bu dövrdə sünni məscidlər, abidələr, elmi, mədəni bir çox miras, kitablar məhv edildi, alimlər öldürüldü və təqib olunmağa başlandı. Məhz, Səfəvilər sülaləsinin iqtidarı zamanı, xüsüsilə şah İsmayıl tərəfindən şiəlik rəsmi məzhəb elan edildikdən sonra dövlət terroru və basqıları nəticəsində məmləkət əhalisi böyük ölçüdə

---

[1] Menderes Kurt,"Safavi dönemi şii ülema ve velayeti fakihin ortaya çıkışını hazırlayan süreç", səh 10
[2] eyni yerdə, səh 6

şiələşdirildi. Bu proses sistematik olaraq yüz illərlə davam etdirildi. Xüsusən, 1514-cü ildə baş vermiş Çaldıran məğlubiyyətindən sonra bu mərhələ daha da sürətləndi. Məqsəd Osmanlı, özbək və digər türk, müsəlman sünni xalqlar, dövlətlər ilə mübarizə şəraitində öz ölkəsində onlara qarşı məzhəbçilik zəminində mübarizə apara biləcək, mərkəzi ideoloji dövlətə bağlı olacaq xalq kütlələri yetişdirmək və onların dəstəyini qazanmaqdı. Beləliklə, o vaxta qədər türk boyları, dövlətləri arasında baş vermiş siyasi çəkişmələr, müharibələr Səfəvilər zamanında artıq daha çox nifrət üzərinə qurulu, ideoloji, məzhəb savaşlarına çevrildi.

**"Şiəlik indiki formada məhz, Səfəvilər dövründə formalaşmağa başlandı. Beləki, ölkədə lazımi səviyyədə şiə din adamları, üləma olmadığına görə şah İsmayıl və Təhmasib dövründə dövlət Nəcəf, Bəhreyn və Livandan bir çox şiə üləmanı, din adamını ölkələrinə dəvət etmişdi. Məqsəd onların vasitəsilə idarə etdikləri ölkədə əhaliyə şiəliyi təbliğ etmək, müharibə apardıqları sünni dünyasına qarşı ideoloji zəmində alternativ bir din anlayışı təqdim etməkdi."**[1]

**"Səfəvilər dövründə on iki imami şiə firqəsi dövlətin dəstəyi və təşkilatçılığı ilə molla sinfi vasitəsilə şeyxülislamlıq təsisatı tərəfindən idarə olunan mütəşəkkil təşkilat halına gətirilmişdi. Bu dövrdə çoxlu şiə fiqhi, rəvayyət kitabları yazılmış, məzhəbin üsul, furu qaydaları tərtib olunmuş, müctəhidlik təsisatı yaradılmışdı. Bütün bu reform hərəkatını ilk dəfə Livandan dəvət olunmuş şeyx Kərəki əl Amili (öl.mil. 1534) şah Təhmasibin dəstəyi ilə həyata keçirmişdi. O, şah Təhmasibin zamanında "müctəhidlərin sonuncusu" və "imamın vəkili" ünvanlarını almış, şahın başına şəxsən özü tac qoymuşdu. Səfəvilər zamanı imami şiəliyin üsuli və əxbari qolları arasında olan ixtilaflar, şiə üləmanın üsuli qolunun dövlət idarəetməsində iştirakı bu məzhəbi olduqca şəkilləndirmişdi. Xüsusilə qeyd etmək lazımdır ki, üləmanın ictimai-siyasi həyata aktiv müdaxilə etməsinə tərəfdar olan, şeyx Kərəkinin təmsil etdiyi üsuli düşüncənin Mehdinin gəlişinə qədər iqtidarlarla əlaqə qurmaq və ictimai-siyasi həyatda iştirak etməyə qarşı olan əxbari düşüncə üzərində qələbə çalması bir dönüş nöqtəsi olmuşdu. Üsulilərin əxbari alimlər üzərində üstünlük əldə etməsinin ən böyük səbəbi o idi ki, onlar iqtidarla əməkdaşlıq edir, onlardan vəzifə və hədiyyə olaraq böyük mülklər, torpaq sahələri alırdılar.Beləliklə, azlıqda qalmış əxbari üləma tədricən marginal qrupa çevrilməyə başladı və əsasən İranda Xuzistan və İraqda ərəb şiələr arasında yayılmış oldu."**[2]

**"Əxbari düşüncəyə görə hər bir dini məsələ rasional əqlə deyil, peyğəmbər və imamlardan varid olan xəbərlər (rəvayyətlər) əsasında açıqlanmalıdır. Üsuli düşüncənin tərəfdarları isə meydana çıxan bəzi problemləri, məsələləri əqli yolla və ictihad edərək həll etməyə çalışırdılar."**[3]

**"İrana "Cəbəli Amil"dən (Livanın dağlıq bölgəsi) dəvət olunan şiə üləma ənənəvi olaraq üsuli məktəbi təmsil edirdi. Bu ərazinin coğrafi olaraq əlverişli mövqedə yerləşməsi, sünni və şiələr arasında təmasın sıx olması mövcud şiə icmasına da təsir etmişdi. Bölgədə yaşayan şiə din adamları sünni üləma ilə**

---

[1] eyni yerdə, səh 7-8
[2] eyni yerdə, səh 11
[3] eyni yerdə, səh 12

**qurduqları təmas nəticəsində praqmatik yanaşma sayəsində əxbari düşüncəyə sahib şiə din adamlarına qarşı üstünlük əldə etmişdilər."[1]**

**"Nümunə olaraq, şiə alimlərindən "Cəbəli Amil" dən olan "Şəhidi-əvvəl" kimi tanınan Şəmsəddin Muhəmməd ibn Məkkinin (öl.mil.1384) Məkkə, Mədinə, Şam, Qüdsə gedərək qırxdan çox sünni alimdən dərs aldığı nəql olunur. O, imami şiə olaraq, üsuli məktəbin fiqhi metod və qaydalarını təyin etmişdi. Həmçinin, şiəlikdə "Şəhidus-Sani" olaraq tanınan Zeynuddin ibn Nurəddin Əli (öl.mil 1558) sünni dünyasını gəzmiş, on altı əhli sünnə alimdən dərs almış, zamanında Osmanlı dövləti tərəfindən Nuriyyə mədrəsəsinə təyin edilmişdi. Sünni alimlərdən aldığı hədis elmi sayəsində hədis metodologiyası ilə bağlı sistematik şəkildə elmi əsər qələmə alan ilk şiə alimi olduğu qeyd olunur. İrana dəvət olunan şeyx Kərəki də Misirdə olarkən sünni alimlərdən təfsir, hədis elmlərini əxz etmişdi."[2]**

**"Şah İsmayıl və xüsusən Təhmasibin dövründə şeyx Kərəkinin təmsil etdiyi üsuli düşüncə, ictihada qarşı çıxan ənənəvi əxbari məktəbin önünə keçərək, bir sıra ifrat şiə fikirlərdən uzaqlaşıb, mötədil cizgiyə dönmüşdü. Bununla belə o ölkədən sünni alimləri qovdu,ilk üç xəlifəyə, sünni alimlərə lənət oxumağın icazəli olduğuna dair fətva verdi və məscidlərdə qiblənin yerini (bucağını) dəyişdi."[3]**

**"Dövlətdən "naibul imam" fəxri adı alan Kərəki ilk dəfə "adil bir fəqihin imamı təmsil edə biləcəyi" fikrini irəli sürmüşdü. Kərəki "Camiul Məqasid" kitabında ölmüş müctəhidə təqlidin caiz olmadığı, cümə namazını müctəhidin qıldıra biləcəyi və s. bunun kimi özündən öncə heç bir şiə aliminin demədiyi fikirləri söyləmişdi. Onun iqtidarla sıx münasibətləri, dövlətin maraqlarını din adına müdafiə etməsi əxbari cəbhəsində kəskin etirazlarla qarşılanırdı. Katifi kimi öndə gələn əxbari şiə alimləri Kərəkini ən çox qəsb yolu ilə iqtidar olmuş siyasi qüvvə ilə sıx münasibətlərə görə tənqid edirdi. Çünki, Kərəki dövlətin maraqlarına uyğun fətvalar verir və şiə ənənəsinə görə imamın hakimiyyətindən savayı qeyri qanuni sayılan bir iqtidarı məşrulaşdırırdı. Kərəkiyə qədər şiələr əsasən yalnız Qaim Mehdinin imamlıq edə biləcəyinə, yalnız onun hökmləri icra edə və cümə namazı qıldıra biləcəyinə etiqad edirdilər."[4]**

**"Kərəki tərəfindən irəli sürülən "imamın vəkilliyi" konsepsiyası o dövrdə üsuli və əxbari düşüncəli şiə din adamları arasında əsas mübahisə predmeti olmuşdu. İctihada açıq üsuli anlayış ənənəvi əxbari düşüncənin kəskin müxalifətinə baxmayaraq, imamın yoxluğunda müctəhidə ictimai-siyasi həyatda önəmli səlahiyyətlər verirdi. Üsuli nəzəriyyəyə görə adil bir fəqih ictihad edərək, idarəetmə ilə bağlı olan bir sıra öhdəlikləri (cihada rəhbərlik və qənimət bölgüsü, cəza və hökmləri tətbiq etmə, zəkat və xümsü toplama, dövlət məmuru olmaq və s.) icra etmədə ixtiyar sahibi hesab olunurdu. Beləliklə, ənənəvi "imamı gözləmə" etiqadına alternativ olan bu nəzəriyyəyə görə hökmdarın himayəsi altında olan üləma imamın vəkili funksiyasını yerinə yetirə biləcəkdi. Əxbari anlayışa görə isə imamın qeybdə olduğu dövrdə heç bir fəqih imamın vəkili ola bilməzdi. Çünki, şiəlikdə məqbul**

---

[1] eyni yerdə, səh 23
[2] eyni yerdə, səh 13
[3] eyni yerdə, səh 15
[4] eyni yerdə, səh 16

**olan qaydaya görə Mehdinin bayrağından öncə qaldıran istənilən bayraq sahibi tağutdur!"**[1]

**"Səfəvi dövründə kənardan gətirilən üsuli üləmanın iştirakı və dövlətin dəstəyi ilə ölkədə bütün dini fəaliyyətlər dini qurumun "Sədr" in nəzarətinə verilmişdi. Bu idarə şiəliyin təbliğini təşkil edir, böyük şəhərlərə şeyxülislam və məscidlərə imam təyin edirdi. Bunun sayəsində ölkədə yayqın olan aşırı, qulat şiə fikirlərin müəyyən qədər qarşısı alındı və molla, axund, müctəhid sinfi yaradıldı."**[2]

Bənzər proses Roma imperiyasında miladi 4-cü əsrdə imperator Konstantin tərəfindən həyata keçirilmişdi. O zaman kilsə islahatları aparılmış və "papalıq" təsisatı yaradılmışdı.

**"Səfəvilər molla sinfini yaratmaqla siyasi və hərbi güclərinə dini, ideoloji güc də qatmaq istəyirdilər. Həmçinin, dövlət bu sinif vasitəsilə ölkədə sufi təriqətlərinin güclənməsini və Qızılbaşların təsirini azaltmağı düşünürdü."**[3]

**"17-ci əsrdə Səfəvi dövlətinin zəifləməsi ilə molla sinfi daha da ön plana çıxdı. Həmçinin, uzun illər sürən üsuli - əxbari ixtilafı daha da kəskinləşmişdi. Əxbari cərəyanının önəmli simalarından olan Molla Muhəmməd Əmin Əstərabadi (öl.mil 1624) öz dövründə bu məktəbi canlandırdı. O, ictihad düşüncəsini, müctəhidləri rədd etmiş, üsuli alimləri din düşməni adlandırmışdı. Ona görə imamın vilayəti bir beyətdir. Əhli beyt rəvayyət çizgisindən çıxmış fəqihlərin vilayəti qəbul edilə bilməz. Əxbari düşüncəyə görə imamlardan rəvayyət olduğu təqdirdə fəqihin ictihad etməsi və ona təqlid edilməsi caiz deyil. Əxbarilər üsulilərin imamın vəkilliyi konsepsiyasından doğan bütün ictihadi fəaliyyətlərini rədd edirdilər. Əstərabadinin əxbari anlayışını böyük şiə alimləri hesab olunan Muhəmməd Təqi əl Məclisi (öl.mil 1660) və Muhsin Feyz Kəşani (öl.mil 1680) mənimsəmişdilər. Həmçinin, məşhur şiə mühəddisi olan Hurr Amili (öl.mil 1693) də əxbari düşüncəni müdafiə etmişdir. Səfəvi şiə üləmanın siyasi və dini sahələrdə olan nüfuzu Molla Muhəmməd Baqir əl Məclisinin (öl.mil 1699) zamanında ən yüksək məqamına yetişdi. Paytaxt İsfəhanda şeyxulislam olan Məclisi dövrünün padşahları ilə sıx münasibət saxlayırdı. O, şiə dünyasında ən çox əsər yazan və tələbə yetişdirən alim hesab olunur. Ən məşhur əsəri çox cildli "Biharul ənvar" kitabıdır. Əxbari cərəyanına mənsub olan, həyatını hədisə sərf etmiş Məclisi əqli elmlərə çox etibar etməmiş, imamlardan varid olan rəvayyətləri təbliğ etməklə bu sahəni canlandırmışdı.**

**Məclisi şeyxulislam olaraq, dövlətdə dini iearxiyanın ən üst qatında təsis olunmuş "mollabaşı" lıq adlı yeni qurumun rəhbəri təyin olundu. Onun dünyəvi və dini sahələrdə fəaliyyəti sayəsində ölkədə şiə din adamlarının siyasi və ictimai sahələrdə nüfuzu xeyli artdı və molla sinfi böyük təşkilatçılıq mərhələsi keçdi.**

**Həyatının son dörd ilini dövləti faktiki olaraq o idarə edirdi. O, əvvəllər dövləti təmsil edən Kərəki və digər üləmadan fərqli olaraq sadə xalqa daha yaxın idi. Sadə dildə farsca yazdığı risalələri xalqın yanında ona böyük nüfuz qazandırmışdı. Onun əxbari cərəyana mənsub olmasına baxmayaraq, etdikləri gələcəkdə üsuli üləma və bu düşüncənin güclənməsinə səbəb olacaqdı. Onun zamanında imamların qəbrinin**

[1] eyni yerdə, səh 17
[2] eyni yerdə, səh 19
[3] eyni yerdə, səh 19

**ziyarəti, matəm və aşura mərasimləri daha öncə görünməmiş şəkildə rituallaşdı, kütləvi hal aldı. Şiəlikdə bugün davam edən əksər ənənələrin əsli o dövrə dayanır. İmamların müxtəlif sahələrdə rəvayyətlərini özündə əks etdirən farsca yazdığı çoxlu risalələri və dövlətin dəstəyi ilə bunların ölkədə yayılması ona böyük şöhrət və güc qazandırmışdı. Məclisi dövlətdən aldığı dəstək ilə üç sahəyə önəm vermişdir. Birincisi, fəlsəfə və təsəvvüfü (sufilik) təzyiq altında saxlayırdı.**

**İkincisi, imami şiəlik əqidəsini ölkədə əsaslı şəkildə bərqərar etmək və sistematik olaraq təbliğ etmək üçün böyük fəaliyyətlər göstərdi. Üçüncüsü, sünnə əhli olmaqla digər bütün dini camaatların fəaliyyətini sıfıra endirməyə çalışdı. Məclisinin tətbiq etdiyi bu basqı siyasətinin sonralar 1722-ci ildə İranın əfqanlar tərəfindən istila olunmasına səbəb olduğu iddia olunur. Məclisi kəlam və fiqhdə əxbari metodu izləmişdir. Bununla yanaşı o, üsuli üləmanın yaratdığı mühitdə yetişdiyi və iqtidarla sıx əlaqə saxladığına görə digər əxbari din adamlarına görə daha mötədil olmuşdu. O, ənənəvi şiə fiqhindən fərqli olaraq, daha praqmatik davranıb, sünnə fiqhində olduğu kimi hakimin zalım vəya adil olmasından asılı olmayaraq ona itaət etmənin vacib olduğunu qeyd edirdi. Məclisi və ondan sonrakı dövrlərdə güclənən molla sinfi tədricən dövlət iqtidarı kimi böyük nüfuz dairələri əldə edərək, zaman-zaman siyasi iqtidara bəzən dəstək, bəzən də rəqib olmuşdu. Siyasi böhranlar, iqtidar boşluğu, daxili çəkişmə və müharibələrdən asılı olmayaraq İranda üləma sinfi daima güc qazanmışdı. 18-ci əsrdə Səfəvi dövlətinin süqutu və iqtidar boşluğu zamanı üləma sinfi dövlətin edə bilmədiyi bir çox funksiyalarını icra edirdi. 19-cu əsrə gəldiyimizdə İranda Qacarlar iqtidarı zamanı "mərceyi-təqlid" müəssisəsi yaradıldı. Qaydaya görə ölkədə şiə olan hər kəs istər kəndçi olsun, istərsə də şah, mərceyi təqlidə dini məsələlərdə tabe olmalı idi. Dini hakimiyyəti əlində cəm edən bu qurum siyasi iqtidarların zəifliyi və nüfuzdan düşdüyü dövrlərdə xalqın müraciət etdiyi alternativ bir dövlət müəssisəsi rolunu oynayırdı. Bu qurum və keçilən tarixi mərhələ gələcəkdə "vilayəti fəqih" konsepsiyasının yaranmasına və 1979-cu ildə şiə üləma sinfinin iqtidar olmasına zəmin yaratdı."[1]**

**"Səfəvilər zamanı imami şiəliyin üsuli və əxbari qolları arasında olan ixtilaflar, "qaib imamın" yoxluğu şəraitində üsuli şiə üləmanın dövlət idarəetməsində iştirakı bu məzhəbi olduqca şəkilləndirmişdi. İmami şiəlik üzərində icra edilən islahat çalışmaları, təsis edilən molla, axund, müctəhidlik təsisatları gələcəkdə "vilayəti fəqih" (fəqihin idarəetməsi, hökmdarlığı) konsepsiyasının yaranması üçün zəmin hazırlamışdı. 16-cı əsrdə şeyx Kərəki tərəfindən təsis edilmiş "naibul imam" (imamın vəkili) qurumu və şah Təhmasibin də fərmanla onu "naibul imam" və "xatəmul muctəhidun" (müctəhidlərin sonuncusu) ünvanı ilə təltif etməsi dövlətdə şiə din adamlarına geniş imkanlar yaratmışdı. Şah Kərəkiyə dövlət məmurlarını təyin etmə və azad etmə səlahiyyəti vermişdi. O də öz növbəsində imam Mehdinin naibi olaraq, şaha öz adından ölkəni idarə etmə səlahiyyəti vermişdi."[2]**

**"Şiə din adamlarına verilən səlahiyyətlər və onların cəmiyyətdə nüfuzunun artması sonradan gələcəkdə taxta çıxacaq olan şahları da onlardan asılı vəziyyətə salmışdı. Məşhur və çox nüfuzlu şiə alimi olmuş Məclisi (öl.mil 1699) öz dövründə**

---

[1] eyni yerdə, səh 21-25

[2] əl Katib, "Şiada siyasal düşüncenin gelişimi", səh 357, 363; Uysal, "Velayeti fakih teorisi üzerine", səh 6

**dövlətdə bütün üləmanın başçısı və şeyxülislam olaraq, dövləti faktiki olaraq idarə edirdi. Onun islahatları, molla sinfinə qazandırdığı böyük nüfuz və başlatdığı ənənələr sayəsində İranda artıq hər kəs (istər şah olsun, istərsə də xalq) şəriət qanunlarına görə böyük fəqihin müctəhid olaraq ölkəni idarə etmə səlahiyyətlərinə sahib olduğuna, şahın da bu hökmlərə tabe olmalı olduğuna inanmağa başladı. Cəmiyyətdə belə düşüncə formalaşmışdı ki, hökmdar müctəhidə bağlı olmaqla yalnız onun rizası ilə fəaliyyət göstərməlidir."[1]**

**"18-19-cu əsrlərdə İranda molla, müctəhid sinfi qeyri rəsmi, amma faktiki olaraq dövləti təmsil etməklə yanaşı siyasi iqtidarlara real müxalif ola biləcək qüvvə halına gəlmişdi. Müctəhidlər imamın vilayətini təmsil etdiklərini iddia edərək, cəmiyyətdə dövlət əhəmiyyətli bir sıra mühüm öhdəlikləri yerinə yetirirdilər. 19-cu əsrdə Qacarlar dövründə müctəhidlər tərəfindən "mərceyi-təqlid" qurumunun təsis edilməsi ilə mollaların siyasi nüfuz dairəsi daha da genişləndi. "Mərceyi-təqlid" nəzəriyyəsinə görə hər sıravi şiə "mərceyi-təqlid" ünvanı daşıyan müctəhidə təqlid etmək məcburiyyətində idi. Fikirləri, fətvaları qeyd şərtsiz qəbul edilən "mərceyi-təqlid" dini, fiqhi, əhkam məsələlərində olduğu kimi ictimai və siyasi sahələrdə də söz sahibi idi. 20-ci əsrin əvvəllərində İranda Qacarlardan sonra iqtidarı ələ keçirən Rza şah Pəhləvi ölkədə Atatürk modeli dünyəvi bir respublika qurmaq istəyirdi. Lakin, mollaların etirazı və müxalifəti ilə qarşılaşdıqdan sonra monarxiya üsul idarəsi qurmaq qərarına gəldi. Nəticə etibarilə o hərbi diktator olaraq, ölkədə Avropa sayağı modernləşmə və islahatlar aparmağa başladı. Fransa mədəni qanunlarını tətbiq edərək, şəriət məhkəmələrinin yerinə dünyəvi, mədrəsələrin yerinə qismən dünyəvi təhsil sistemi formalaşdırdı. Bu islahatlar müctəhidlərin ictimai və siyasi sahələrdə olan nüfuzunu azaltdı. Onların bir qismi ənənəvi şiə düşüncəsinə qayıdaraq, siyasətdən kənar qalmağı seçdilər. Bir qisim müctəhidlər isə ona və oğlu Muhəmməd Rza şaha qarşı müxalif düşərgədə yer aldılar. İranda 1946-61-cı illərdə "mərceyi-təqlid" olmuş Ayətullah Burucərdi və mühafizəkar üləma siyasətdən kənarda qalmış, ölkədə baş verən siyasi çevriliş və önəmli hadisələr qarşısında belə səssiz qalmışdılar. Burucərdi və mühafizəkar üləmanı bu mövqeyinə görə tənqid edən bir qisim din adamları "mərceyi-təqlid" təsisatının yenidən gözdən keçirilməli olduğu fikrini irəli sürməyə başladılar."[2]**

**"Bu dövrdə müctəhidlər "mərceyi-təqlid" qurumu haqqında fərqli fikirlər irəli sürərkən, Ayətullah Təbatəbai kimi bir sıra müctəhidlər isə öndə gələn fəqihin siyasi nüfuzunun da olmasının tərəfdarı idilər. Mərcii fəqihin siyasətə məsafəli qalmasına tərəfdar olan Burucərdinin cizgisində olan şiə üləma əsasən Nəcəfdə Ayətullah Muhsin Təbatəbai və ondan sonra Əbul Qasim əl Xoyi ətrafında toplanarkən, İranda Xomeyni mərcii olaraq ön plana keçməyə başladı. O, 1962-ci ildə şah rejiminə qarşı aktiv müxalif mövqeyə keçdiyinə görə təzyiqlərə məruz qaldı, Türkiyə və İraqda sürgündə qaldı. 1969-70 illərdə İraqda olarkən, "fəqihlərin naibliyi" nəzəriyyəsi ilə Molla Əhməd ən Nəraqinin (öl.1829) "vilayəti fəqih" nəzəriyyəsini birləşdirərək yeni bir siyasi nəzəriyyə yaratmağa çalışdı. Beləliklə, Xomeyni 16-cı əsrdə Səfəvilər dövründə, şeyx Kərəki tərəfindən başladılan "imamın naibi" (vəkili) nəzəriyyəsinin**

---

[1] Black,"Siyasal İslam düşüncesinin tarihi", səh 321, 332; Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 6

[2] Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 7

**və 19-cu əsrdə Qacarlar dövründə yaradılmış "mərceyi-təqlid" təsisatının əsasında öz nəzəriyyəsini təkmilləşdirərək, fəqihin dini və dünyəvi idarəçiliyini özündə əks etdirən "vilayəti fəqih" konsepsiyasını tərtib etdi."**[1]

**"O, şiəlikdə indiyə kimi fəqihlərin öz adlarından hökmdarlara idarə etmə səlahiyyəti verdiyi mərhələsindən fəqihlərin birbaşa əmirliyi öz əllərinə aldığı yeni bir mərhələyə keçid almışdı. O, "Mehdinin intizarı" və buradan çıxan hökmlərlə bağlı ənənəvi şiə nəzəriyyəsini rədd etmiş, cəmiyyətin hər zaman adil şəkildə idarə olunması üçün şəri hökümətlərə ehtiyyac olduğunu bildirirdi. Ənənəvi şiə etiqadına görə imam Mehdi gələnə qədər cihad, cümə, şəriət hököməti qurmaq və s. hökmləri icra etmək təxirə salınmış hesab olunur. Xomeyniyə görə şəriətin və vəd olunan İlahi hökümətin qurulması üçün yalnız imam Mehdinin gəlməsini gözləmək ən batil bir inancdır və bunu iddia edənlər əslində İslamın hökmlərinin icra olunmasına qarşı çıxırlar. O, qeyd edirdi ki, imamın gəlişi min illər davam edə bilər. Bu zaman ərzində imamın naibi olacaq bir adil fəqihin ümmətin işlərini idarə etməsi zəruridir."**[2]

**"Ruhullah Xomeyni 1971-ci ildə qələmə aldığı "Hukumətul İslamiyyə" kitabında monarxiyanı İslama zidd bir quruluş olaraq vəsf etmiş, üləmanın dövlət idarəetməsində, sosial və siyasi sahələrdə aktiv iştirak etməsinin zəruriliyini vurğulamışdı. Bu əsərdə İslam dövlətinin yaranmasının əhəmiyyəti, mövcud rejimlərin sekulyar olduğu üçün cəmiyyətləri ifsada apardıqları oxucuya izah olunurdu. Kitabda İslam dövlətinin necə, hansı metodlarla idarə olunmalı olduğunu şiəliyin "vilayət" inancından çıxış edərək izah etmişdi. Şiəliyə görə ümmətin işlərini bəlli imamlar idarə etdiyinə və sonuncu imam da "qeybə çəkildiyinə" görə bu sahədə böyük bir boşluq yaranmışdı. 70 il sırası ilə 4 nəfər naib imami şiə icmasını "kiçik qeyb" dövründə Mehdinin adından idarə etmişdi. Ondan sonra "böyük qeyb" dövrü başlamış və icma ilə Mehdinin birbaşa təması kəsilmişdi. Bütün bunları ələ alan Xomeyni sonuncu imamın qeybi dövründə şiələrin siyasi, ictimai, sosial, dini sahələrdə fəaliyyətlərini tənzimləyəcək bir mexanizmin olmasının zəruriliyini qeyd edirdi. Bütün bu problemləri çözə biləcək şəxsin, qurumun dövləti təmsil edəcək qüvvələr olduğunu vurğulayır və bu quruluşun nə monarxiya nə də qərb demokratik dəyərlərinə bənzər bir sistem olmayacağını qeyd edirdi. Xomeyniyə görə 4 naibin olduğu "kiçik qeyb" dövründən sonra idarəetmə səlahiyyəti fəqihlərə keçmişdir."**[3]

**"Xomeyniyə görə qeybət dövründə dövlət qurmaq və onu idarə etmək haqqı yalnız fəqihlərə verilə bilərdi. Ona görə rəhbər və hakimdə olması zəruri olan fəqihllik və ədalət vəsflərinə sahib olan hər bir fəqih peyğəmbər və imamlar kimi ümmət üzərində vilayət haqqına sahibdir. Çünki, fəqihin vilayəti İlahi bir təmələ əsaslanır. Allah peyğəmbər və imamlara verdiyi vilayət (idarəetmə) haqqını fəqihlərə də vermişdir. Fəqihlərə bu haqq Allahdan verildiyinə görə bütün fəqihlər vilayət haqqına bərabər ölçüdə sahibdirlər."**[4]

**"1979-cu ildə İranda sağ və sol qüvvələrin, dindar, kommunist və digər siyasi, ictimai təşkilatların iştirakı ilə inqilab baş verdi. Bu zaman Xomeyni Fransadan**

---

1 İsmayıl Səfa Üstün, "Vilayəti fəqih" - Türkiyə Diyanət İslam ensiklopediyası, c. 43,səh 19

2 əl Katib, "Şiada siyasal düşüncenin gelişimi", səh 528; Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 9

3 "Safavi dönemi şii ülema ve velayeti fakihin ortaya çıkışını hazırlayan tarihsel süreç", səh 4

4 əl Katib, "Şiada siyasal düşüncenin gelişimi", səh 531; Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 9

**təyyarə ilə İrana gətirildi və hamının ortaq namizədi, nüfuz sahibi fəqih olaraq, inqilab "rəhbər" i təyin edildi. Belə olan halda o illərdir tərtib etdiyi, fikir və mülahizələr bildirdiyi "vilayəti fəqih" konsepsiyasını real həyatda tətbiq etmə imkanı tapdı. Əsas problem və çətinliklər də məhz o zaman yaranmağa başladı. Yeni tərtib olunan konstitusiyada prezident, baş nazir, "rəhbər"in səlahiyyətləri və öhdəlikləri müəyyən olunanda Xomeyni "rəhbər" olaraq, özü üçün çox geniş səlahiyyətlər istəyirdi. Xomeyniyə görə rəhbər olan fəqih öz məşruiyyətini xalqdan deyil, imam Mehdidən aldığına görə onun səlahiyyətləri çox geniş olmalıdır. O xalqın səs çoxluğu ilə seçilə bilməz və xalqın razılığına da ehtiyyac duymaz. Fəqih olaraq, ictihad edər və doğru hesab etdiyini icra eləyə bilər. Xalqın vəzifəsi isə ona tərəddüd etmədən, sorğu-sualsız itaət etməkdir. "Vilayəti fəqih" nəzəriyyəsinə görə Allah tərəfindən imamın öhdəlikləri verilən fəqih cəmiyyətin iradəsi ilə hesablaşmağa məcbur deyil."[1]**

**"İnqilabdan sonra 1979-cu ildə qəbul edilən konstitutsiya özündə Fransa respublika sistemi, insan və Allah haqqları, demokratiya və şəriət, xalqın və haqqın səsi və s.bunun kimi anlayışları ehtiva edirdi. Konstitutsiyanın giriş fəslində Allaha, axirət gününə, İlahi ədalətə, Hz Muhəmmədə, oniki imama, imam Mehdinin gəlişinə və ən önəmlisi Xomeyninin "vilayəti fəqih" inə inanc vurğulanır. Bəzi maddələrdə Xomeyni "Böyük fəqih", "Ruhani rəhbər", "İnqilab rəhbəri", "İslam Cumhuriyyətinin banisi" və "Ümmətin imamı" kimi adlarla vəsf olunur. Konstitutsiyada "Rəhbər" ə çox böyük, görülməmiş səlahiyyətlər verilirdi. Təkcə onu demək kifayətdir ki, xalqın səs çoxluğu ilə seçilən prezidenti o vəzifəsindən kənarlaşdıra bilmə haqqına sahibdir və prezidentliyə namizədləri də o təsdiq edir. Edvard Abramyan "Müasir İran tarixi" kitabında[2] yazır ki, Xomeyni şahların belə xəyal etdiyi konstitutsiyon səlahiyyətlərə sahib olmuşdu."[3]**

**"Vilayəti fəqih" nəzəriyyəsinin konstitutsiyada yer alması və tətbiq edilməsi şiə siyasi düşüncəsində böyük mübahisələrə səbəb olmuşdu. Ona qarşı olanlar əsasən üç qrupa bölünür: Bu nəzəriyyəni bütünlüklə rədd edənlər, qismən, məhdud ölçüdə qəbul edənlər və mövcud praktikaya etiraz edənlər. İnqilabdan sonra ölkədə qızğın konstitutsiya müzakirələri gedərkən, Ayətullah Şəriətmədari və Ayətullah Mahmud Taleqani ümməti tək bir fəqihin deyil, şura ilə idarə olunması fikrini irəli sürürdü. İnqilabın əsas fiqurlarından və İranda böyük nüfüz sahibi olan şiə alimi Şəriətmədari deyirdi: "Bizim istədiyimiz və can atdığımız, idarəetməni xalqın öz əlinə almasıdır. İslam Cumhuriyyəti məhz budur. Çünki, bir şəxsin vəya qrupun hökmranlığı ələ keçirməsi və xalqı idarə etməsi caiz deyil. Azad seçkilərdə xalqın öz təmsilçilərini seçməsi millətin təbii haqqıdır. Xalqı idarə etmək istəyən hər bir hökümət prezident seçimindən sonra məclisin (parlamentin) razılığını almalıdır. Məclis qərar qəbul edərkən çoxluğun səsini nəzərə almalıdır. Çünki, xalqın əksəriyyəti müsəlmandır və qanunların da şəriətə zidd olması caiz deyil."[4]**

---

[1] əl Katib, "Şiada siyasal düşüncenin gelişimi", səh 556-557; Uysal, "Velayeti fakih teorisi üzerine", səh 12

[2] Edvard Abramyan ,"Müasir İran tarixi" səh 214

[3] Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 12

[4] Ustün, İsmail Safa,"Velayeti fakih", TDV İslam ensiklopediyası, c. 43, səh 19-22; Musa Uysal, "Velayeti fakih teorisi üzerine", səh 13

Qeyd etmək lazımdır ki, şeyx Şəriətmədari digər müxalif fəqihlər kimi Xomeyni tərəfindən ev dustağı edilmişdi və bu şəkildə dünyadan köçmüşdü.
İranda illərdir mühafizəkar və islahatçılar arasında davam edən siyasi rəqabət və ixtilaflar böyük ölçüdə "vilayəti fəqih" nəzəriyyəsindən qaynaqlanır və günümüzdə də çox aktiv şəkildə davam etməkdədir.